# MƏDƏNİ NİTQƏ VERİLƏN TƏLƏBLƏR

Nitq mədəniyyəti danışıq və yazı zamanı orfoqrafik və orfoepik qaydalara, qrammatik qayda-qanunlara, üslub normalarına əməl etmək, zəngin söz ehtiyatına malik olmaq, nitqin etik normalarını gözləməkdir. Nitq mədəniyyəti nitqin müxtəlif şəraitində məzmun və məqsədə uyğun olaraq ədəbi dilin yazılı və şifahi formalarından, ifadəlilik vasitələrindən istifadə edə bilmə bacarığıdır. Lakin dilin qrammatik qaydaları və tələffüz normalarını bilməklə nümunəvi nitqə yiyələnmək olmaz. Çünki bunlar şifahi və yazılı nitqə verilən birinci tələb və nitq mədəniyyətinin ilk pilləsi hesab olunur. Yüksək səviyyəli nitq dedikdə, ilk növbədə, təsirli, aydın, ifadəli və kütləvi nitq nəzərdə tutulur. Sözlərin formaca düzgün qurulmasına baxmayaraq, oradakı fikirlər aydın, dəqiq və ifadəli olmaya da bilər. Mədəni nitqi şərtləndirən bir sıra tələblər (əslində onlar mədəni nitqin keyfiyyətləridir) var, onlar aşagıdakılardır:

1. *Nitqin aydınlığı*
2. *Nitqin təmizliyi*
3. *Nitqin orijinallığı*
4. *Nitqin zənginliyi*
5. *Nitqin münasibliyi*
6. *Nitqin rabitəliliyi*
7. *Nitqin yığcamlığı*
8. *Nitqin sadəliyi*
9. *Nitqin ifadəliliyi*

## Nitqin aydınlığı

Aydınlıq dinləyici və oxucunun nitqi asanlıqla anlaması, başa düşməsidir. Aristotel nitqin aydınlığını ünsiyyət üçün başlıca şərt sayır və göstərirdi ki, nitq aydın deyilsə, demək, o öz məqsədinə çata bilməmişdir. Nitqin aydınlığı üçün əsas amil danışanın (eləcə də oxuyanın və yazanın) nitq obyekti haqqında mükəmməl məlumata malik olmasıdır. Natiqlər sadə, aydın cümlələrlə, faktlarla, dəlillərə əsaslanaraq danışır və yazır, işlədilən hər bir sözün əhəmiyyətini, ifadə olunan fikir üçün onun nə dərəcədə yararlı olduğunu aydın təsəvvür edirlər. Nitq zamanı

aydınlığın pozulmasının bir səbəbi dili, sözlərin mənasını, işlənmə məqamını və s. yaxşı bilməmək, zəngin söz ehtiyatına sahib olmamaqdır.

Düzgün olmayan tələffüz – səslərin öz məxrəcində deyilməməsi, qarışdırılması, bəzən də səslərin, hecaların tələffüzdən düşməsi, məzmuna, məqsədə uyğun intonasiyaya əməl olunmaması və s. də nitqin aydınlığına xələl gətirən səbəblərdir. Normal nitq tempindən yavaş və ya əksinə, iti danışanlara təsadüf etmək çətin deyildir. Iti templə danışarkən sözlər yarımçıq tələffüz olunur. Belə nitqi eşitmək və qavramaq çətin olur. Sözlərin əvvəli və ya axırı "udulur", səslər anlaşılmır.

Kütlə qarşısında, auditoriyada çıxış edən nitqinin aydın olması üçün aşağıdakılara əməl etməlidir:

1) Danışılacaq mövzu ətrafında əvvəlcə düşünmək, lazımi material və faktlar toplamaq, həmin materialları sistemləşdirmək;

2) Mətn yazılıdırsa, dönə- dönə oxumaq, oradakı əsas fikri ifadə edən sözləri (məntiqi vurğulu sözləri) aydın və nəzərəçarpacaq dərəcədə tələffüz etməyə nail olmaq;

3) Məzmuna uyğun intonasiya seçə bilmək;

4) Mətndə qarşıya çıxa biləcək mənası çətin sözləri (alınma sözləri, terminləri, neologizmləri, köhnəlmiş sözləri və s.) izah etmək;

5) İstinad olunan mənbəni (əsər, məqalə, radio və televiziya verilişləri və s.) göstərmək, fikri, çıxarılan nəticəni misallarla əsaslandırmaq;

6) Auditoriya ilə (eləcə də müsahiblə) əks əlaqəni yaratmaq – sual vermək, cavab almaqla deyilənlərin başa düşüldüyünü, mənimsənildiyini müəyyənləşdirmək, lazım gələrsə əlavə şərh vermək;

Nitqin aydınlığını yaradan amillərdən biri də **diksiyadır.** Diksiya latınca dictio sözündən alınmışdır, mənası sözlərin düzgün, səslərin öz məxrəcinə uyğun şəkildə tələffüz olunması deməkdir. Aydın və oxunaqlı xətt yazılı nitqin asan anlaşılmasına nə dərəcədə şərait yaradırsa, düzgün diksiya da şifahi nitqin başa düşülməsi, qavranılmasını o dərəcədə təmin edir. Diksiyanın pozulması zamanı danışıqda sözlər "ağızdan tökülür", çox zaman sözün axırı, əvvəli aydın deyilmir, səslər qarışdırılır, bitişik şəkildə tələffüz olunur. Məsələn; bizəldi (bizə gəldi), gətdi (gətirdi), gə gedək (gəl gedək), lazım təşkilatlar (lazımi təşkilatlar), çəkşə

gələnlər (çəkilişə gələnlər), oagörə (ona görə), sonsamitlə bitən (sonu samitlə bitən), ümqrammatik (ümumi qrammatik), sutiyada (studiyada) və s.

Diksiyanın pozulması sözlərin, ifadələrin başa düşülməsini, fikrin anlaşılmasını bir qədər çətinləşdirir. Belə nitqi dinləyən gərginlik keçirir, tez yorulur, söhbətin mabədi ilə az maraqlanır, diqqətini başqa istiqamətə yönəldir. Diksiyanın pozulması səbəblərindən biri danışıq və ya oxu zamanı nəfəsin düzgün tənzim olunmamasıdır. Aydın tələffüzdə danışıq üzvü kimi dişlərin də rolu böyükdür. Natiqin ağzında dişlərin normal vəziyyətdə olması bu səbəbdən xüsusi əhəmiyyət kəsb edir. Üst qabaq dişlərin olmaması və ya seyrəkliyi d, z, l, n, s, t kimi dil-diş samitlərinin tələffüzünü çətinləşdirir, səslər yarımçıq formalaşır, məna itir. Düzgün tələffüzdə, səslərin formalaşmasında çənələr, xüsusən alt çənə fəal iştirak edir. Alt çənənin enməsi və qalxması ilə ağız boşluğunun həcminin daralması və genişlənməsi nəticəsində müxtəlif səslər yaranır. Bəzən danışanlarda alt çənənin mühərrikliyinin zəifliyi tələffüzdə süstlüyə, ləngiməyə, ölüvaylığa səbəb olur. Deyilənlər yaxşı qavranılmır, dinləmə istənilən səviyyədə getmir. Belə hala yol verməmək üçün natiqin çənəsi, necə deyərlər, möhkəm olmalıdır.

## Nitqin təmizliyi

Mədəni nitqə verilən əsas tələblərdən biri də onun təmizliyidir. Bu o deməkdir ki, ədəbi dilin normalarına uyğun gəlməyən dil vahidləri (sözlər, ifadələr, frazeologizmlər, cümlələr və s.) nitqdə işlədilməməlidir. Nitqin təmizliyi digər mədəni keyfiyyətlər kimi, danışanın təhsili, mədəniyyəti və tərbiyəsi ilə bilavasitə əlaqədardır. Dilin təmizliyini qoruyub saxlamaq üçün aşağıdakılara əməl olunmalıdır:

1) Nitqdə **məhəlli dialektlərə, yerli şivələrə** məxsus danışıq tərzinə yol verilməməlidir. Bu cür dialektizmlərin, şivə sözlərinin işlənməsi nitqi korlayır, danışığa xələl gətirir.

2) **Əcnəbi sözlər** lüzumsuz işlədilməməlidir. Bəzi hallarda natiqlər heç bir ehtiyac olmadan nitqlərini çətin, mənası çoxları üçün aydın olmayan terminlərlə doldururlar ki, nəzərdə tutulan fikir, məzmun bu terminlərin kölgəsində itib-batır, mətləb dinləyici üçün aydın olmur. Hansı səbəbdən olur-olsun, dilimizdə eyni mənanı verən sözün əvəzində alınmanın işlədilməsi dili korlamaqdır, onun gözəlliyini pozmaqdır, ümumiyyətlə, dilimizə biganəlikdir, hörmətsizlikdir.

3) **Tüfeyli və ya parazit sözlərlə** bağlı qüsurlar aradan qaldırılmalıdır. Bəziləri danışıq zamanı qurmaq istədikləri cümlələri tamamlaya bilmir, zəruri sözləri tapmaqda çətinlik çəkirlər. Bu səbəbdən danışan yersiz fasilələr etmək məcburiyyətində qalır, mətnlə əlaqəsi olmayan sözlər, ifadələr işlətməli olur: əsas etibarilə, deməli, məsələn, türkün məsəli, zaddı, ən azı, ona görə ki, şeydi, beləliklə, adı nədir, adını sən de, hansı ki, haradasa, canım sənə desin, baxanda baxıb görürük ki və s. Belə sözlər nitqi zibilləyir, onda qırıqlıq, uyğunsuzluq, rabitəsizlik əmələ gətirir, dinləyicilərdə xoşagəlməz bir duyğu və təəssürat yaradır.

4) **Jarqon sözlərin və varvarizmlərin** işlədilməsi (məsələn; znaçit, voobşe, tem bolli, mejdu proçim, niçeqo sebe, kakraz, toçno və s. kimi) nitqin təmizliyinə xələl gətirir, onun keyfiyyətini aşağı salır.

5) Mədəni danışıqda başqasını təhqir etmək, heysiyyətinə toxunmaq məqsədini daşıyan **söyüş və qarğışlara, ədəbsiz, təhqiramiz, qeyri-etik sözlərə, ifadələrə** (anqırmaq, bağırmaq, soxuşdurmaq, xosunlaşmaq, donqullanmaq, burcutmaq, qatıqlamaq, qanmaq, tülkü, ayı, eşşək, qoduq, heyvərə, alçaq, tupoy, qanmaz, gəbərtmək, qırıldamaq, burnunu söxmaq, kəllən haqqı, çərənləmək, başı girməyən yerə bədənini soxmaq, hırıllamaq, hürkmək, xoruzlaşmaq və s.) yer verilməməlidir.